Allah bizi nə üçün yaradıb?

Allah bizi yaradıb ki, yalnız Ona ibadət edək və heç bir şeyi Ona şərik qoşmayaq.

**«Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!»** (əz-Zariyat, 56)

**«Allahın bəndələr üzərində olan haqqı Ona ibadət edib heç bir şeyi Ona şərik qoşmamaqdır».** (əl-Buxari və Muslim)

Allaha necə ibadət etməliyik?

Allaha ixlasla, Onun və Peyğəmbərinin (s.ə.s) buyurduğu kimi ibadət etməliyik.

**«Halbuki Onlara əmr edilmişdi ki, Allaha – ixlasla, dini yalnız Ona aid edərək, ibadət etsinlər»** (əl-Beyyinə, 5)

**«Bizim işimizə** [dinimizə] **müvafiq olmayan bir əməl edən kimsənin etdiyi əməl rədd olunur».** (Muslim)

Məgər Allaha qorxu və istəklə ibadət etməliyik?

Bəli, biz Allaha qorxu və istəklə ibadət etməliyik.

**«Allaha həm qorxu, həm də istəklə dua** [ibadət] **edin!»** [yəni, Cəhənnəm əzabından qorxaraq və Cənnət nemətlərini istəyərək.]
(əl-Əraf, 56)

**«Mən Allahdan Cənnət istəyirəm və atəşdən** [Cəhənnəm əzabından] **Ona pənah aparıram».** (Əbu Davud - «səhih»dir)

İbadətdə ehsan nə deməkdir?

Bu, Allahın bizi daim gördüyünü etiqad etmək deməkdir.

**«Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir!»** (ən-Nisa, 1) **«O Allah ki səni namaza duranda da görür».** (əş-Şuara, 218)

**«Allaha elə ibadət et ki, sanki sən Onu görürsən, sən Onu görməsəndə O səni görür!».** (Muslim)

Allah nə üçün peyğəmbərlər (a.s) göndərmişdir?

Allah peyğəmbərləri (a.s) ona görə göndərib ki, insanları Ona ibadət etməyə və heç bir şeyi Ona şərik qoşmamağa dəvət etsinlər.

**«Biz hər ümmətə: «Allaha ibadət edin, Tağutdan çəkinin!» - deyə peyğəmbər göndərmişdik».** (ən-Nəhl, 36)

**«Peyğəmbərlər başqa-başqa qadınlardan olan qardaşlardır! Anaları ayrı, dinləri isə vahiddir.** [yəni, hər bir peyğəmbər tövhidə (Tək Allahlığa) dəvət etmişdir]». (Muslim)

Üluhiyyə tövhidi nədir?

Bu, dua, nəzir, qurban və s. ibadətləri yalnız Allah üçün etməkdir.

**«Bil ki, Allahdan başqa heç bir ilah yoxdur!»** [yəni, Allahdan başqa həqiqi (ibadətə layiq olan) məbud yoxdur.] (Muhəmməd, 19)

**«Qoy sənin onları dəvət edəcəyin ilk şey - Allahdan başqa heç bir ilahın olmamasına şəhadət gətirmək olsun!».** (əl-Buxari və Muslim)

«Lə ilahə illəllah»ın mənası nədir?

Mənası: «Allahdan başqa həqiqi (ibadətə layiq olan) məbud yoxdur».

**«Bu** [deyilənlər] **ona görədir ki, Allah haqq,** [müşriklərin] **Ondan qeyri ibadət etdikləri isə batildir».** (Loğman, 30)

**«Lə ilahə illəllah deyən və Allahdan qeyri ibadət olunanları inkar edən hər kimsənin malı da, qanı da haramdır.** [yəni, malını mənimsəmək və qanını axıtmaq]**».** (Muslim)

«Allahın sifətlərində tövhid» nə deməkdir?

Allahın ad və sifətlərini Quranda və peyğəmbərin (s.ə.s) hədislərində vəsf olunduğu kimi təsdiq etməkdir.

**«Ona bənzər heç bir şey yoxdur. O** [hər şeyi] **eşidəndir,** [hər şeyi] **görəndir!»**

(əş-Şura, 11)

**«Sizin Uca Rəbbiniz hər gecə** [Özünə layiq keyfiyyətdə] **dünya səmasına nazil olur».**

(Muslim)

Tövhidin müsəlmana olan səmərəsi nədir?

Hər bir müsəlman tövhidi qəbul etməklə dünyada haqq yola yönəlir, axirətdə isə əmin-amanlıqda olur.

**«İman gətirib imanlarını zülmlə qatışdırmayanlar əmin-amanlıqdadırlar. Haqq yola yönəlmişlər də onlardır!»** (əl-Ənam, 82)

**«Bəndələrin Allah üzərində olan haqqı Ona şərik qoşmayana əzab verməməsidir».**

(əl-Buxari və Muslim)

Allah haradadır?

Allah ərşin üzərindədir.

**«Rəhman ərşin üzərinə istiva etdi!** [yəni, ucaldı və yüksəldi]**».** (Taha, 5)

**«Allah bir yazı yazdı: «Həqiqətən, Mənim rəhmətim qəzəbimi qabaqladı». Bu da Onun dərgahında, ərşin üzərində** [olan lövhi-məh-fuzda] **yazılmışdır».** (əl-Buxari)

Allahın zatı ilə bizimlədir yoxsa elmi bizimlədir?

Şübhəsiz ki, Allahın elmi bizimlədir. O hər şeyi görür və eşidir.

**«Allah dedi: «Qorxmayın, Mən də sizinləyəm,** [hər şeyi] **eşidirəm və görürəm!»** [yəni, Öz köməyi və himayəsiylə] (Taha, 46)

**«Doğrusu siz** [hər şeyi] **eşidəni**, [sizə] **yaxın olanı çağırırsınız! O da sizinlədir.** [yəni, sizi görür və eşidir]**».** (əl-Buxari və Muslim)

Ən böyük günah nədir?

Ən böyük günah Allaha şərik qoşmaqdır.

**«Oğlum! Allaha şərik qoşma. Doğrudan da, Allaha şərik qoşmaq böyük zülmdür!** [Ən böyük günahdır.]» (Loğman, 13)

**«Peyğəmbərdən** (s.ə.s) **: «Hansı günah Allah yanında ən böyük günah sayılır?» - deyə soruşduqda o belə demişdir: «Səni yaradan Allaha şərik qoşmağın!».** (Muslim)

Ən böyük şirk nədir?

İbadəti Allahdan qeyrisinə etmək ən böyük şirkdir. Məsələn, Allahdan qeyrisinə dua etmək və s.

«[Ya Peyğəmbər!] **De ki: «Mən ancaq öz Rəbbimə ibadət edirəm və heç kəsi Ona şərik qoşmuram!»** (əl-Cinn, 20)

**«Günahların ən böyüyü Allaha şərik qoşmaqdır».** (əl-Buxari)

Ən böyük şirkin zərəri nədir?

Ən böyük şirk əbədi Cəhənnəmdə qalmağa səbəb yaradır.

**«Allaha şərik qoşana Allah, şübhəsiz ki, Cənnəti haram edər. Onun düşəcəyi yer Cəhənnəmdir».** (əl-Maidə, 72)

**«Allaha şərik qoşub ölən şəxs Cəhənnəmə daxil olar».** (Muslim)

İnsan şirk edə-edə digər yaxşı əməlləri ona fayda verə bilərmi?

Xeyr, şirk ola-ola yaxşı əməl öz sahibinə heç cür fayda verə bilməz.

**«Əgər onlar** [Allaha] **şərik qoşsaydılar, etdikləri əməllər puça çıxardı!»** (əl-Ənam, 88)

**«Hər kimsə etdiyi əməldə qeyrisini Mənə şərik qoşarsa, Mən onu da, şərik qoşduğunu da tərk edərəm».** (Muslim- «qüdsi hədis»dir.)

Müsəlmanlar arasında şirk mövcuddurmu?

Bəli, təəssüflər olsun ki, mövcuddur, özü də çox.

**«Onların əksəriyyəti ancaq şərik qoşaraq Allaha inanarlar!»** (Yusif, 106)

**«Ümmətimdən olan qəbilələr müşrikləri və bütpərəstləri haxlamayınca** [onların əqidəsini qəbul etməyincə] **qiyamət qopmaz».** (ət-Tirmizi - «səhih»dir)

Allahdan qeyrisinə dua etməyin hökmü nədir?

Allahdan qeyrisinə edilən dua, sahibini Cəhənnəmə varid edən şirkdir.

**«Elə isə çəkin, Allahla yanaşı başqa bir tanrıya dua** [ibadət] **etmə, yoxsa əzaba düçar edilənlərdən olarsan!»** (əş-Şuara, 213)

**«Allahdan qeyrisinə dua** [ibadət] **edib ölən şəxs Cəhənnəmə daxil olar».** (əl-Buxari)

Məgər dua Uca Allah üçün edilən ibadətdir?

Bəli, dua Uca Allah üçün edilən ibadətdir.

**«Rəbbiniz buyurdu: «Mənə dua edin, Mən də sizin dualarınızı qəbul edim! Mənə ibadət etməyi təkəbbürlüklərinə sığışdırmayanlar Cəhənnəmə zəlil olaraq girəcəklər!»**

(Ğafir, yaxud əl-Mumin 60)

**«Dua ibadətdir».** (ət-Tirmizi - «səhih»dir)

Ölülər duanı eşidirlərmi?

Xeyr, ölülər duanı eşitmirlər!

**«Şübhəsiz ki, sən nə ölülərə, nə də dönüb gedən karlara çağırışı eşitdirə bilərsən!»** (ən-Nəml, 80) **«Sən isə qəbirlərdə olanlara eşitdirən deyilsən!»** (Fatir, 22)

**«Həqiqətən, Allahın yer üzünü səyahət edən mələkləri vardır ki, onlar ümmətimin salamını mənə çatdırırlar».** (ən-Nəsai - «səhih»dir)

Ölüdən və ya qeybdə olandan kömək diləyə bilərikmi?

Xeyr, nə ölüdən, nə də qeybdə olandan kömək diləmək olar! Əksinə, biz yalnız Allahdan kömək diləməliyik.

**«O zaman siz Rəbbinizdən kömək diləyirdiniz. O da sizə cavab verdi** [duanızı qəbul etdi]**».** (əl-Ənfal, 9)

**«Peyğəmbərə** (s.ə.s) **bir narahatlıq və ya bir müsibət üz verdikdə deyərdi: «Ey əbədi, ey əzəli** [olan Allah]**! Sənin rəhmətinlə Səndən kömək diləyirəm».** (əl-Hakim - «həsən»dir)

Allahdan qeyrisindən kömək diləmək olarmı?

Xeyr! Allahdan qeyrisindən kömək diləmək olmaz.

**«Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!»** (əl-Fatihə, 5)

**«**[Bir şey] i**stəsən yalnız Allahdan istə, kömək diləsən yalnız Allahdan dilə!»** (ət-Tirmizi - «həsən, səhih»dir)

Aramızda olan dirilərdən kömək istəyə bilərikmi?

Bəli, yalnız səni eşitdikləri təqdirdə və qadir olduqları işlərdə bizəköməklik göstərməyi onlardan istəyə bilərik.

**«Yaxşılıq etməkdə və pis əməllərdən çəkinməkdə əlbir olun, günah iş görməkdə və düşmənçilik etməkdə bir-birinizə kömək göstərməyin!»** (əl-Maidə, 2)

**«Qul** [Allah bəndəsi] **öz qardaşına kömək etdikcə Allah ona kömək edər».** (Muslim)

## Allahdan qeyrisi üçün nəzir vermək olarmı?

Allahdan qeyrisi üçün nəzir vermək olmaz.

**«İmranın zövcəsinin: «Ey Rəbbim, bətnimdəkini Sənə xidmətkar olmaq üçün nəzir edirəm. Məndən qəbul et! Əlbəttə, Sən eşidən və bilənsən!» - dediyini xatırla!»**

(Ali-İmran, 35)

**«Kim Allaha itaət etməyi nəzir edibsə qoy Ona itaət etsin və kim də Allaha asi olmağı nəzir edibsə qoy Ona asi olmasın!»**

(əl-Buxari)

Allahdan qeyrisi üçün qurban kəsmək olarmı?

Allahdan qeyrisi üçün qurban kəsmək olmaz, çünki bu böyük şirkdir.

**«Rəbbin üçün namaz qıl və qurban kəs!»** [Belə ki, qurbanı yalnız Allah üçün kəsmək lazımdır.] (əl-Kəusər, 2)

**«Allahdan qeyrisi üçün qurban kəsən hər kimsəyə Allah lənət etmişdir!»** (Muslim)

Qəbirə tərəf namaz qılmaq caizdirmi?

Xeyr, qəbirə tərəf namaz qılmaq olmaz.

**«Üzünü Məscidülharama** [Kəbəyə] **tərəf çevir!»** (əl-Bəqərə, 144)

**«Qəbirlərin üstündə oturmayın və onlara tərəf namaz qılmayın».** (Muslim)

Sehr etməyin hökmü nədir?

Sehr etmək küfrdür.

**«Süleyman kafir olmadı, lakin şeytanlar sehri xalqa öyrədərək kafir oldular!»**

(əl-Bəqərə, 102)

**Peyğəmbər** (s.ə.s) **buyurdu: «Yeddi böyük günahdan çəkinin!» Səhabələr: «Bunlar hansılardır» - deyə soruşduqda, o dedi: «Allaha şərik qoşmaq, sehr etmək,…»** (Muslim)

Kahinə və qeybdən xəbər verənə inana bilərikmi?

Qeybdən verdikləri xəbərləri təsdiq etməməliyik.

**«De: «Allahdan başqa göylərdə və yerdə olan heç kəs qeybi bilməz!»** (ən-Nəml, 65)

**«Kim qeybdən xəbər verənin, yaxud kahinin yanına gəlib onların dediklərini təsdiqləyərsə artıq Muhəmmədə nazil olana** [Qurana] **küfr etmiş olar».** (Əhməd - «səhih»dir)

Kimsə qeybdə olanları bilirmi?

Qeybdə olanları Allahdan başqa heç kəs bilmir.

**«Qeybin açarları Allahın yanındadır. Onları ancaq Allah bilir».** (əl-Ənam, 59)

**«Qeybdə olanları Allahdan başqa heç kəs bilmir».** (ət-Təbərani - «həsən»dir)

Allahdan qeyrisinə and içmək olarmı?

Xeyr, Allahdan qeyrisinə and içmək olmaz.

**«De: «Rəbimə and olsun ki, siz mütləq diriləcəksiniz».** (ət-Təğabun, 7)

**«Kim Allahdan qeyrisinə and içərsə artıq şirk etmiş olar».** (Əhməd - «səhih»dir)

Həmayil (göz muncuğu və s.) və tilsimlər asmaq olarmı?

Onları asmaq olmaz, çünki bunu etmək şirkdir.

**«Əgər Allah sənə bir sıxıntı versə,** [səni ondan] **Allahdan başqa heç kəs qurtara bilməz. Əgər Allah sənə bir xeyir yetirsə,** [heç kəs Ona mane ola bilməz]. **Çünki O, hər şeyə qadirdir!»** (əl-Ənam, 17)

**«Kim** [gözdəymədən və s. qorunmaq üçün] **tilsim asarsa artıq şirk etmiş olar».** (Əhməd - «səhih»dir)

Uca Allaha nə ilə təvəssül etməliyik?

Allaha saleh əməllərlə, Onun ad və sifətləri ilə təvəssül etməliyik.

**«Ən gözəl adlar Allahındır! Onu bu adlarla çağırıb dua edin»** (əl-Əraf, 180)

**«Sənin Özünə verdiyin, Sənə məxsus hər bir adla Səndən istəyirəm!»**

(Əhməd - «səhih»dir)

Dua etdikdə yaradılanların vasitəçiliyinə ehtiyac olurmu?

Xeyr, dua etdikdə yaradılanların vasitəçiliyinə ehtiyac olmur.

«[Ya Muhəmməd!] **Bəndələrim Məni səndən soruşsalar, Mən onlara yaxınam. Dua edib Məni çağıranın duasını qəbul edərəm».**

(əl-Bəqərə, 186)

**«Doğrusu siz** [hər şeyi] **eşidəni**, **yaxın olanı çağırırsınız! O da sizinlədir».** [yəni, sizi görür və eşidir.] (əl-Buxari və Muslim)

Peyğəmbərin (s.ə.s) vasitəçiliyi nədir?

Peyğəmbərin (s.ə.s) vasitəçiliyi Allahın ona nazil etdiyini təbliğ etməkdir.

**«Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə endirilmiş olanı təbliğ et»** (əl-Maidə, 67)

**Peyğəmbərin** (s.ə.s) **səhabələri: «Biz şəhadət gətiririk ki, artıq sən təbliğ etdin, yerinə yetirdin və nəsihət etdin!» söylədikdə o demişdir: «Allahım şahid ol!»** (Muslim)

Peyğəmbərin (s.ə.s) şəfaətini kimdən istəməliyik?

Biz Peyğəmbərin (s.ə.s) şəfaətini yalnız Allahdan istəməliyik.

**«De ki: «Şəfaət bütünlüklə Allaha məxsusdur».** (əz-Zumər, 44)

**«Allahım, onu mənə şəfaətçi et!».** [yəni, Peyğəmbəri (s.ə.s)] (ət-Tirmizi - «həsən»dir)

Allahı və Onun Rəsulunu (s.ə.s) necə sevməliyik?

Məhəbbət itaət etməklə və buyuruqları yerinə yetirməklə həqiqi məhəbbət hesab olunur.

«[Ya Muhəmməd] **De ki: «Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın».**

(Ali-İmran, 31)

**«Sizdən biriniz məni valideynindən, övladından və bütün insanlardan çox sevməyincə iman gətirmiş olmaz».** (Muslim)

Peyğəmbəri (s.ə.s) mədh etdikdə mübaliğə edə (həddi keçə) bilərikmi?

Peyğəmbəri (s.ə.s) mədh etdikdə mübaliğə etmək olmaz.

**«De ki: «Mən də sizin kimi bir insanam. Mənə vəhy olunur ki, sizin ilahınız tək olan Allahdır».** (əl-Kəhf, 110)

**«Nəsranilər Məryəm oğlunu** [mədh edib] **mübaliğə etdiyi kimi, siz də məni** [mədh edib] **mübaliğə etməyin! Mən ancaq bir qulam. Odur ki, deyin: «Allahın qulu və elçisidir!»** (əl-Buxari)

İlk yaradılan məxluq kimdir?

İnsanlardan Adəm (a.s) , əşyalardan isə qələm ilk yaradılmış məxluqdur.

**«O zaman sənin Rəbbin mələklərə belə demişdir: «Mən palçıqdan bir insan** [Adəmi] **yaradacağam!»** (Sad, 71)

**«Həqiqətən, Allahın yaratdığı ilk məxluq qələmdir».** (Əbu Davud, ət-Tirmizi - «həsən, səhih»dir)

Muhəmməd (s.ə.s) nədən xəlq edilib?

Allah Muhəmmədi (s.ə.s) nütfədən xəlq etmişdir.

**«Sizi** [atanız Adəmi] **torpaqdan, sonra nütfədən, sonra laxtalanmış qandan yaradan Odur!»** (Ğafir, yaxud Mumin 67)

**«Həqiqətən, sizlərdən hər biri anasının bətnində xəlq olunarkən** [hamiləliyin ilk] **qırx günündə nütfə halında olur,…».** (əl-Buxari və Muslim)

Möminlər üçün dostluq nə deməkdir?

Bu, tək Allaha ibadət edən möminləri sevmək, onlaraköməklik göstərmək deməkdir.

**«Mömin kişilər və mömin qadınlar bir-birinə dostdurlar!»** (ət-Tövbə, 71)

**Peyğəmbər** (s.ə.s) **: «Həqiqətən, mömininin möminə bağlılığı, daşları bir-birinə keçmiş binaya bənzəyir!» - deyib barmaqlarını çarpazlaşdırdı.** (Muslim)

Kafirləri sevmək, onlara kömək etmək olarmı?

Xeyr! Kafirləri sevmək, onlara kömək etmək olmaz.

**«Sizdən kim onlarla** [kafirlərlə] **dostluq edərsə, o da onlardandır».** (əl-Maidə, 51)

**«Şübhəsiz ki, Əbu filankəsin ailəsi** [kafir olduqlarına görə] **mənim dostlarım deyillər».**
(əl-Buxari və Muslim)

Kimdir həqiqi vəli (dost)?

Həqiqi vəli yalnız Allahdan qorxan mömindir.

**«Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər. O kəslər ki, iman gətirmiş və Allahdan qorxmuşlar».** (Yunus, 62, 63)

**«Mənim dostum ancaq Allah və saleh möminlərdir».** (əl-Buxari və Muslim)

## Allah Quranı nə üçün nazil edib?

Allah Quranı nazil edib ki, onu oxuyub əməl edək. [Şübhəsiz ki, onu büküb harasa qoymaq, yaxud asmaq heç bir fayda verməz.]

**«Rəbbinizdən sizə nazil edilən Qurana tabe olun. Allahı qoyub başqa havadarlara uymayın. Siz öyüd-nəsihətə olduqca az qulaq asırsınız!»** (əl-Əraf, 3)

**«Quran oxuyun və ona əməl edin, onu atıb getməyin və onda mübaliğə etməyin, onu qazanc mənbəyinə çevirməyin və onu mənimsəməyin!»** (Əhməd - «səhih»dir)

Hədislərsiz, yalnız Quranla kifayətlənə bilərikmi?

Yalnız Quranla kifayətlənmək Allahın qoyduğu şəriətə, Peyğəmbərin (s.ə.s) və onun ardıcıllarının tutduğu yola ziddir.

**«Sənə də Zikri** [Quranı] **nazil etdik ki, insanlara onlara nazil ediləni izah edəsən və bəlkə, onlar da düşünüb dərk edələr!»** (ən-Nəhl, 44)

**«Doğrusu mənə Quranla birlikdə onun mislində olan** [Sünnə] **verildi!».** (Əhməd - «səhih»dir)

Hər hansı bir sözü Allahın və Onun rəsulunun sözündən önə keçirə bilərikmi?

Heç bir sözü onların sözündən üstün hesab etmək olmaz.

**«Ey iman gətirənlər!** [Sözləriniz və hərəkətlərinizlə] **Allahın və Peyğəmbərinin qabağına keçməyin. Allahdan qorxun».** (əl-Hucurat, 1)

**«Allaha asi olaraq** [kiməsə] **itaət etmək olmaz! Yalnız** [asilik olmayan] **yaxşı işlərdə itaət etmək olar!».** (Əbu Davud - «səhih»dir)

Aramızda mübahisə düşsə nə etməliyik?

Mübahisə düşəndə Qurani Kərimə və səhih sünnəyə dönmək vacibdir.

**«Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin!»**

(ən-Nisa, 59)

**«Sizə iki şeyi tərk edirəm ki, onlardan yapışsanız heç vaxt zəlalətə düşməzsiniz! Bu, Allahın kitabı və peyğəmbərinin sünnəsidir».**

(Malik - «səhih»dir)

Dində olan «bidət» nədir?

Şəriətdə (Quran və Sünnədə) dəlili olmayan hər bir şey bidətdir.

**«Yoxsa müşriklərin Allahın dində izn verməmdiyi bir şeyi onlar üçün qanuni** [halal] **edən şərikləri vardır».** (əş-Şura, 21)

**«Bizim işimizə** [dinimizə] **ondan olmayan bir yenilik gətirənin gətirdiyi rədd edilir».** [Qəbul olunmur] (əl-Buxari və Muslim)

Dində gözəl «bidət» varmı?

Xeyr! Dində gözəl «bidət» yoxdur.

**«Bu gün dininizi tamamlayıb mükəmməl etdim, sizə olan nemətimi başa çatdırdım və bir din kimi sizin üçün İslamı bəyənib seçdim».** (əl-Maidə, 3)

**«Sizə** [dinə əlavə edilən] **yeniliklərdən çəkinməyi əmr edirəm! Həqiqətən, hər bir yenilik bidətdir və hər bir bidət də zəlalətdir».**

(Əbu Davud - «səhih»dir)

İslamda gözəl «sünnə» varmı?

Bəli, islamda gözəl «sünnə» var. Xeyirxah işlərdə nümunə olmaq kimi.

**«Və o kəslər ki: «Ey Rəbbimiz bizə zövcələrimizdən və uşaqlarımızdan gözümüzün işığı olacaq övladlar bəxş et və bizi müttəqilərə imam et!»** [yəni, xeyirxah işlərdə nümunə et!] **deyərlər».** (əl-Furqan, 74)

**«Kim islamda** [unudulmuş] **gözəl bir sünnəni bərpa edərsə, ona həm öz əməlinin, həm də ondan sonra həmin sünnəyə əməl edənin savabı qədər savab yazılar».** (Muslim)

İnsan öz nəfsini islah etməklə kifayətlənə bilərmi?

İnsan həm öz nəfsini, həm də yaxınlarını islah etməlidir.

**«Ey iman gətirənlər! Özünüzü və əhli-əyalınızı elə bir oddan qoruyun ki, onun yanacağı insanlar və daşlardır».** (ət-Təhrim, 6)

**«Hər biriniz hamidir və hər biriniz də himayəsində olanlar barədə sorğu-sual ediləcəkdir. Rəhbər öz rəiyyəti barədə sorğu-sual ediləcək…»** (ət-Tirmizi)

Müsəlmanlar nə zaman qələbə çalacaqlar?

Müsəlmanlar yalnız Allahın kitabına və Peyğəmbərinin (s.ə.s) sünnəsinə əməl etdikdə qələbə çalacaqlar?

**«Ey iman gətirənlər! Əgər siz Allaha** [Allahın və Peyğəmbərinin dininə] **yardım göstərsəniz, O da sizə yardım göstərər və sizi sabitqədəm edər».** (Muhəmməd, 7)

**«Qiyamətə qədər ümmətimdən qələbə çalan bir tayfa olacaq».** (İbn Macə - «səhih»dir)